AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRLİYİ
BAKI DÖVLƏT UNİVERSİTETİ

МИНИСТЕРСТВО ОБРАЗОВАНИЯ АЗЕРБАЙДЖАНСКОЙ РЕСПУБЛИКИ
БАКИНСКИЙ ГОСУДАРСТВЕННЫЙ УНИВЕРСИТЕТ

MINISTRY OF EDUCATION OF AZERBAIJAN REPUBLIC
BAKU STATE UNIVERSITY



# "KİTABİ-DƏDƏ QORQUD" VƏ TÜRK DÜNYASI

"Kitabi-Dədə Qorqud"un tərcüməsi və nəşrinin
200 illiyinə həsr olunmuş

# BEYNƏLXALQ ELMİ KONFRANSIN MATERİALLARI

29 dekabr 2015-ci il

BAKI - 2015

AZƏRBAYCAN RESPUBLİKASI
TƏHSİL NAZİRLİYİ
BAKI DÖVLƏT UNİVERSİTETİ

МИНИСТЕРСТВО ОБРАЗОВАНИЯ
АЗЕРБАЙДЖАНСКОЙ РЕСПУБЛИКИ
БАКИНСКИЙ ГОСУДАРСТВЕННЫЙ
УНИВЕРСИТЕТ

MINISTRY OF EDUCATİON OF
AZERBAIJAN REPUBLİC
BAKU STATE UNIVERSITY

# "KİTABİ-DƏDƏ QORQUD" VƏ TÜRK DÜNYASI

*"Kitabi-Dədə Qorqud"un tərcüməsi və nəşrinin 200 illiyinə həsr olunmuş*

BEYNƏLXALQ ELMİ KONFRANSIN

# MATERİALLARI

*29 dekabr 2015-ci il*

Bakı-2015

# "Kitabi-Dədə Qorqud"un alman dilində ilk tərcüməsi və nəşrinin 200 illiyinin qeyd edilməsi haqqında

## *Azərbaycan Respublikası Prezidentinin* Sərəncamı

2015-ci ildə Azərbaycan xalqının mədəni sərvətlər xəzinəsində müstəsna yer tutan və əsrlərdən bəri milli-mənəvi varlığın ayrılmaz tərkib hissəsinə çevrilən "Kitabi-Dədə Qorqud" abidəsinin alman şərqşünas alimi Fridrix fon Dits tərəfindən üzə çıxarılması, nəşr edilməsi və dünya elm aləminə tanıdılmasının 200 illiyi tamam olur.

Ötən müddət ərzində "Dədə Qorqud" dastanları ilə bağlı çox sayda araşdırmalar aparılmış və qorqudşünaslığın ayrıca sahə kimi formalaşdırılması istiqamətində mühüm addımlar atılmışdır. 2000-ci ildə "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileyinin YUNESKO xətti ilə beynəlxalq səviyyədə təntənəli qeyd edilməsi abidənin tədqiqi tarixində yeni mərhələnin başlanğıcı olmuşdur.

Milli-mədəni irsin qorunub yaşadılması və yeni nəsillərin azərbaycançılıq ruhunda tərbiyə olunmasında "Dədə Qorqud" dastanlarının böyük əhəmiyyətini nəzərə alaraq, qorqudşünaslığın sistemli fəaliyyətinin təmin edilməsi məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq qərara alıram:

1. Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Milli Elmlər Akademiyası ilə birlikdə, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzinin, Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun və Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, "Kitabi-Dədə Qorqud"un alman alimi Fridrix fon Dits tərəfindən ilk tərcüməsi, nəşri və dünya elm aləminə tanıdılmasının 200 illiyinə dair fəaliyyət proqramını hazırlayaraq təsdiq olunmaq üçün Azərbaycan Respublikasının Nazirlər Kabinetinə təqdim etsin.
2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.



***İlham Əliyev***
***Azərbaycan Respublikasının Prezidenti***
***Bakı şəhəri, 20 fevral 2015-ci il.***

## TƏŞKİLAT KOMİTƏSİ

| | | | |
|---|---|---|---|
| Akad. | A.M.Məhərrəmov — | Rektor | – sədr |
| Prof. | İ.N.Əliyeva — | Tədrisin təşkili və təlim texnologiyaları üzrə prorektor | – sədr müavini |
| AMEA-nın müxbir üzvü, prof. | A.H.Kazımzadə — | Elm və innovasiyalar üzrə prorektor | – sədr müavini |
| Prof. | S.T.Hacıyev — | Sosial məsələlər, tələbələrlə iş və ictimaiyyətlə əlaqələr üzrə prorektor | – sədr müavini |
| Dos. | M.T.Vəliyev — | Filologiya fakültəsinin dekanı | – üzv |
| AMEA-nın müxbir üzvü, prof. | N.A.Paşayeva — | Klassik Azərbaycan ədəbiyyatı kafedrasının müdiri | – üzv |
| Akad. | T.İ.Hacıyev — | Türkologiya kafedrasının müdiri | – üzv |
| AMEA-nın müxbir üzvü, prof. | N.Q.Cəfərov — | Ümumi dilçilik kafedrasının müdiri | – üzv |
| Prof. | S.Ə.Abdullayeva — | Azərbaycan dilçiliyi kafedrasının müdiri | – üzv |
| Prof. | T.H.Hüseynov — | Müasir Azərbaycan ədəbiyyatı kafedrasının müdiri | – üzv |
| Prof. | C.Q.Nağıyev — | Dünya ədəbiyyatı kafedrasının müdiri | – üzv |
| Prof. | L.H.Quliyeva — | Rus dilçiliyi kafedrasının müdiri | – üzv |
| Prof. | A.C.Hacıyev — | Rus ədəbiyyatı tarixi kafedrasının müdiri | – üzv |
| Prof. | H.A.Əsgərov — | Azərbaycan dili və ədəbiyyatının tədrisi metodikasının müdiri | – üzv |
| Prof. | M.M.Cəfərov — | Təbiət fakültələri üzrə rus dili kafedrasının müdiri | – üzv |
| F.e.d. | R.B.Əsgərov — | Türk xalqları ədəbiyyatı kafedrasının müdiri | – üzv |
| F.e.d. | S.H.Orucova — | Azərbaycan şifahi xalq ədəbiyyatı kafedrasının müdiri | – üzv |
| Dos. | Ə.M.Paşayeva — | Humanitar fakültələr üzrə rus dili kafedrasının müdiri | – üzv |
| Dos. | A.Q.Abbasov — | İngilis dili (təbiət fakültələri üzrə) kafedrasının müdiri | – üzv |
| Dos. | B.İ.Hacıyev — | İngilis dili (humanitar fakültələr üzrə) kafedrasının müdiri | – üzv |
| Dos. | S.V.Abbasova — | Azərbaycan dili kafedrasının müdiri | – üzv |
| Dos. | E.N.Fərəcullayeva — | Alman və fransız dilləri kafedrasının müdiri | – üzv |
| F.ü.f.d. | K.K.Həsənova — | Azərbaycan şifahi xalq ədəbiyyatı kafedrasının müəllimi | – məsul katib |

**ELNUR NECİYEV**
**AMEA-nın A.A.Bakıxanov**
**adına Tarix İnstitutu, doktorant**
***Azərbaycan***

## SƏFƏVİLƏR DÖVLƏTİNİN İNZİBATİ-ƏRAZİ BÖLGÜSÜ

**Açar sözlər:** *Səfəvilər, bəylərbəyilik, mahal, ulka, el, vilayət, nahiyə, sancaq, liva, əyalət, şəhər, vali, hakim*
**Ключевые слова:** *Сефевиды, беглярбегство, магал, улька, племя, вилайет, округ, санджак, лива, провинция, город, правитель*
**Key words:** *Safavids, beglarbegies, county, ulka, tribe, district, sancaq, liva, province, city, governor*

1501-ci ildə Azərbaycan dövlətçiliyi tarixində yeni bir mərhələ başlandı. Şah I İsmayıl (1501-1524) Təbrizi tutmaqla Səfəvilər dövlətinin əsasını qoyduqdan sonra fəthlərlə daha geniş bir ərazidə hakimiyyətini bərqərar etmiş oldu. Səfəvilər dövləti belə bir geniş ərazini idarə etmək üçün bəylərbəyilik və sultan-məliklik idarəçilik aparatına söykənən imperiyanı 4 valiliyə və 13 bəylərbəyiliyə böldü. Doğrudur, XVI-XVII yüzillikdə bəylərbəyiliklərin ərazisi sabit qalmamış, ayrı-ayrı inzibati vahidlərin ərazisi dəfələrlə dəyişmiş şəhər, hətta bütöv bir mahal bir vilayətdən alınıb başqasına verilmişdir. Lakin bütün dəyişikliklərə baxmayaraq, inzibati-ərazi bölgünü ümumi şəkildə izləmək üçün XVIII əsrə aid edilən anonim "Təzkirət əl-müluk" adlı mənbə konkret fikirlər söyləməyə imkan yaradır.

"Təzkirət əl-müluk" adlı anonim mənbə qısa müddətdə, təcili olaraq yazılsa da son dərəcə dəyərli və etibarlı mənbə təəssüratı yaradırdı. Çünki, anonim müəllifin qarşısına qoyulan əsas vəzifə Səfəvi taxt-tacını ələ keçirən əfqanları dövlət işləri ilə tanış etməkdən ötrü bələdçi bir əsər yazmaq idi. Bizim üçün bu əsərdə diqqəti cəlb edən əsas məsələ inzibati-ərazi vahidləri ilə bağlı verilən məlumatlardır. Bu baxımdan mənbədə yer adları və adı çəkilən ərazilərin yerləşmə yeri ilə bağlı dəqiqləşdirilmələr aparılması müqayisəli təhlilin tətbiqinə ehtiyac yaradır. Yalnız bu üsulun tətbiqi ilə Səfəvilər dövlətinin inzibati-ərazi bölgüsü ilə bağlı tam təsəvvür əldə etmək mümkündür.

1501-ci ildə Azərbaycan dövlətçiliyi tarixində yeni bir mərhələ başlandı. Şah I İsmayıl (1501-1524) Təbrizi tutmaqla Səfəvilər dövlətinin əsası qoyuldu. Hind alimi Qulam Sərvər Budaq Münşi Qəzvininin "Cəvahirül-əxbar" əsərinə istinadən yazırdı ki, "Aləmin pənahı olan şah Təbrizə yollandı və Azərbaycan səltənətinin taxtına əyləşdi" [17, 38]. Azərbaycan vilayətinin tutulması ilə yaranan bu dövlət daha sonra fəthlərlə 1514-cü ilə qədər Fəratdan Qəndəhara, Qafqazdan Hind okeanına qədər 2.800.000 $km^2$ ibarət geniş bir ərazidə hakimiyyətini bərqərar etdi [2, 101]. Bu ərazilərdə başlıca idarəçilik aparatı (bəylərbəyilik və sultan-məliklik) inzibati vahidləri çərçivəsində mövcud olmuşdur. XVI-XVII əsrlərdə siyasi-hərbi və inzibati vahid olmaq etibarilə bəylərbəyilik idarəçiliyi müstəsna rol oynamışdır. Səfəvilər dövlətində bəylərbəyi vilayətdə mərkəzi şah hakimiyyətini təmsil etməklə yanaşı, yerlərdəki idarəçilik sisteminin özülü və mücəssəməsi idi. Yerli idarəetmə orqanları sultan və məliklər vasitəsilə yerli vahidlərdə bütün əhali üzərində şahlıq hakimiyyətini təminatçısı rolunu oynayırdı [2, 187]. "Tarix-i aləm aray-i Abbasi"yə əsaslanan V.F.Minorskinin fikrincə, Şah I Abbasa (1587-1629) qədər Səfəvilər dövlətini hakimlər idarə etmişlər. Çünki adı çəkilən mənbədə əyalət başçılarının adları sadəcə olaraq hakimlər kimi çəkilir [21, 163]. Venesiya səyyahı və diplomatı V.D'Alessandri isə göstərir ki, Şah I Təhmasibin (1524-1576) dövründə "dövlət sultanların idarəsi altında olan 50 hissəyə bölünmüşdü" [8, 234]. Bununla belə, İ.P.Petruşevski qeyd edir ki, bəylərbəyilər Şah I Abbasdan xeyli əvvəl mövcud olmuş, Qızılbaş tayfalarından olan məşhur əmirlərdən, yaxud da şahzadələrdən seçilirdi [14, 118]. O.Əfəndiyevə görə alman alimi K.M.Röhrborn da bu fikirdə olub, yazır ki, bəylərbəyilər inzibati və hərbi hakimiyyəti öz əllərində birləşdirmiş, yerli feodal yığma qoşununa (çərikə-E.N.) başçılıq etmişlər. Əyalətlər dövlət vilayətləri idi və daha çox sərhəd ərazilərini əhatə edirdi [3, 263]. "Təzkirət əl-müluk" adlı mənbədə imperiyanın Ərəbistan, Luristan, Gürcüstan, Kürdüstandan ibarət 4 valiliyə və 13 bəylərbəyiliyə böləndüyü qeyd edilmişdir. Vali-

liklərin sıralanması isə onların nüfuzuna görə göstərilmişdir: "Qəndəhar, Şirvan, Herat, Azərbaycan, Çuxur-Səd, Qarabağ və Gəncə, Astrabad, Kuhgiluyə (Fars), Kirman, Mərvi Şahicahan, Qələmrov-i Əlişəkər ölkəsi (Həmədan), Məşhədi müqəddəs-i müəlla, Darüssəltəney-i (paytaxt) Qəzvin"[21, 163]. Müəllifin Qəzvinin həm paytaxt və həm də on üçüncü bəylərbəyilik olmasını qeyd etməsi, bu inzibati bölgünün Şah I Abbasdan əvvəlki dövrə aid olduğunu göstərir. Ona görə ki, XVII yüzillikdə Təbriz, Qəzvin və Herat şəhəri də "darüssəltənə" ünvanına malik idi. Sultanın iqamətgahının yerləşdiyi şəhər, yəni İsfahan isə "məqərərüssəltənə" adlanırdı [2, 101]. Ümumiyyətlə, V.F. Minorski Səfəvilərin dövlət sərhədlərini belə sıralıyır: "A. Şimal-qərb-Azərbaycan və Zaqafqaziya; B. Şərq-Böyük Xorasan; C. Şimal-Xəzər sahili vilayətlər; D. Cənub-şərq-Kirman; E. Mərkəz-İraq; F. Qərb-Kürdüstan və Luristan; G. Cənub və Cənub-qərb: Fars və Xuzistan" [21, 162-163; 3, 294]. Yəzd, Mazandaran, Savə və İraqın bir çox bölgəsi xassənin idarə sistemində yer aldığına görə onlara bu siyahıda yer verməmişdir [12, 295]. Fransız səyyah və missioneri Sansonun 1683-cü il səfər qeydlərinə görə isə "bu ölkə (Səfəvilər dövləti-E.N.) valilər tərəfindən idarə olunan 10 nahiyədən-Gürcüstan, Luristan, Həvize (Ərəbistan), Bəxtiyari, Zeytun-Ərdalan (Kürdüstan), Mazandaran, Çərkəz, Herat, Qəndəhar və Kirman, yaxud Karamaniyədən ibarət idi" [20, 42-43]. Sanson qeyd edir ki, "valilər tərəfindən idarə olunan nahiyələrdən başqa 12 bəylərbəyilik də vardı ki, onlar Təbriz, Kərəc (Kors), Ərdəbil, Lar, Məşhəd, Astrabad, Kirmanşah, Həmədan, Şüştər, Gəncə, Şamaxı, İrəvan vilayətlərindən ibarət olub, hakimləri bəylərbəyi statusuna malik idi" [ 20, 44-45].

1708-1726-cı illərdə dövlətin mərkəzi İsfahanda yaşayan xristian səyyah J.T.Kruşinski isə əsərində Səfəvilər dövlətinin Şah I İsmayılla başlayan və Şah Sultan Hüseynlə (1694-1722) bitən dövrü ərzində 16 əyalət olduğunu sıra ilə belə yazır: "İraqi-Əcəm, Xuzistan, Luristan, Fars, Kirman, Məkran, Sistan, Qəndəhar, Zabulistan (Əfqanıstanın cənubunda əyalət–E.N.), Xo-rasan, Mazandaran, Gilan, Azərbaycan, Rəvan, Şirvan, Dağıstan və Gürcüstan" [19, 18]. Lakin Kruşinskinin bəylərbəyilik, yoxsa valilik əsasında Persiyanın (Səfəvilər dövlətinin-E.N.) 16 əyalətdən təşkil olduğunu yazıb yazması məlum deyil.

Bizim üçün olduqca müstəsna əhəmiyyət kəsb edən Osmanlı dəftərlərinə görə isə Səfəvilərin nəzarətində olan ərazilərin bir hissəsi, xüsusilə də Şimali və Cənubi Azərbaycan torpaqları imperiyanın nəzarət altına düşərkən liva (sancaq), nahiyə, köy və məzra formasında qeydə alınaraq tərtib edilən təhrir dəftərlərinə daxil edilmişdi [10]. Bu dəftərləri tərtib edərkən də Elxanilər dövrünün maliyyə idarələrində fəaliyyət göstərən və məşhur tarixi əsərlər müəllifi Həmdullah Mustovfi Qəzvininin "Nüzhətül-Qülub" əsərində İraqi-Əcəm və Azərbaycan üçün istifadə edilən bölgünün saxlanılması məlum olur [10, 98-99]. Qeyd edək ki, bu əsərdə "Elxanilərin nəzarətində olan Persiya (Səfəvilər dövləti-E.N.) ərazisinin İraqi-Əcəm, Azərbaycan, Muğan və Arran, Kürdüstan, Xuzistan, Fars, Şabankara (Kirmanşahın şimal-qərbində kürd tayfalarından birinin adı–E.N.), Kuhistan (İran yaylasında dağlıq vilayət–E.N.), Xorasan, Kumis (Reydən şərqdə vilayətdir–E.N.), Gilan kimi əyalətlərdən ibarət olması", onların da öz növbəsinə "tümənə, tümənin də şəhər və başqa yaşayış məntəqələrinə bölünməsi" barədə məlumat verilmişdir [18, 32-159].

Ümumiyyətlə, XVI-XVII yüzillikdə bəylərbəyiliklərin ərazisi sabit qalmamış, ayrı-ayrı inzibati vahidlərin ərazisi dəfələrlə dəyişmiş şəhər, hətta bütöv bir mahal bir vilayətdən alınıb başqasına verilmişdir. Yaxud da qərbdə osmanlılarla, şərqdə isə özbəklərlə aparılan müharibələr bəzi ərazilərin itirilməsi, yenidən geri qaytarılması ilə müşayiət olunmuşdur. Bu baxımdan istinad olunan bütün mənbələrdəki məlumatlardan fərqli olaraq "Təzkirət əl-müluk"da inzibati və ərazi bölgüsünü dəqiqliklə verilməsi Səfəvilər dövlətini inzibati baxımdan öyrənilməsi işini daha da asanlaşdırır. Bu mənbəyə görə Azərbaycan bəylərbəyi və ona tabe olan mahal və ulkalar aşağıdakı kimi qeyd olunur: "Astara, Marağa və Müqəddəm eli ulkası (Marağada), Əfşar eli ulkası (Urmiyada), Qaracadağ, Çorş, Kavərd, Qapanat, Vərgəhan, Gərmrud, Adərba eli ulkası, Həştrud və Tabtaba, Mədək, Lahican, Dünbuli eli ulkası (Xoyda), Ucarud, Abdallı eli ulkası, Sərab, Şəqqaqi eli ulkası, Zunuz və Qarnıyarıq, Meşkin, Muğanın əkin yerləri (çaylar) ulkası, Peşək qalası ulkası, Salmas Lək sultanlığı, Qaraağac (Talışda), Şahsevən İnallı ulkası, Sultaniyyə və Zəncan" 18, 164-165]. Eyni adlı mənbənin bir digər nəşrində Çorş əvəzinə Hurs, Qarnıyarıq əvəzinə Qarneyaq qalası, Tabtaba əvəzinə Tabtab ulkası, adı çəkilən ərazilərə əlavə olaraqsa Ənhar ulkasının adı qeyd edilir [22, 72-75]. V.F. Minorskiyə görə mənbədə adı çəkilən "Astara Xəzər sahilində, Əngura, yəni Qızılüzən hövzəsindəki Əngurana, inzibati baxımdan isə Zəncana daxil olan Mara-

ğa və Müqəddəm eli Marağanın şimal şərqində, Əfşar eli ulkası Kuhgiluyədə" yerləşirdi [21, 164]. Lakin mətndə Marağanın və Urmiya gölünün cənub sahilləri boyu məskunlaşan əfşarlardan bəhs edilir [21, 164]. V.F. Minorski daha sonra "Qaracadağın Araz çayının cənub sahilində, Təbrizin şimal-şərqində, Çorsun (yaxud Hurs-E.N.) Qotur çayının sol sahilində, Xoydan şimalda, Qapanatın Araz çayı və Ordubadın şimalında, Həştərudun Səhənd dağlarının şimal-şərq yamaclarında, Lahicanın Uşnudan cənubda türk-fars sərhəddində, Dünbuli eli ulkasının Xoyda, Ucarudun Bərzənd və Bəlhərü çayları arasında, Sərabın Təbrizlə Ərdəbil arasında, Şəqqaqi elinin Muğan və Sərab arasında" olmasını qeyd edirdi [21, 164-165]. V.F.Minorski Kavərd, Adərba eli, Tabtab tayfası, Mədək, Qarni Yarıq, Peşək barədə dəqiq məlumat vermir [21, 164-165]. "Təzkirət əl-müluk"da adı qeyd olunan Abdallu eli Heratda toplu halda yaşayan abdallara işarədir [13, 17-19]. "Təzkirət əl-müluk"dakı Zunuz adlı ərazi hazırda Mərənd şəhristanına daxil olan şəhərdir. Meşkin Savalan dağı və Ərdəbildən şimal-qərbdə, Muğanat Araz çayının aşağı axarı boyunca, Salmas Lək sultanlığı Səlmasda, Qaraağac Göytəpə çayının yuxarı axarı boyunda, Şahsevən İnallı Savə bölgəsində yerləşir [21, 165]. V.F. Minorskinin yerini dəqiq müəyyən edə bilmədiyi Tabtab ulkası Həştərudla birgə Osmanlı təhrir dəftərlərində nahiyə kimi Ərdəbil livasının tərkibində gösərilir [10, 86]. Mədək ulkası isə Cənubi Azərbaycanda, Həsənəbadın 27 km cənub-şərqində yerləşir [1, 389]. Ümumiyyətlə, Azərbaycan bəylərbəyi göründüyü kimi əsasən indiki Cənubi Azərbaycanın ərazisini əhatə etməklə Zəncan, Sultaniyyə, Muğan, Talış və Qapan mahalını da özünə birləşdirirdi. 1683-1685-ci illərdə Səfəvilər dövlətində olmuş alman şəyyah Engelbert Kempfer isə "Azərbaycanın Persiyanın (Səfəvilər dövlətinin-E.N.) şimal-qərbi, şimali Midiya və ondan şimal-qərbdə yerləşən torpaqların bir qismini əhatə etdiyini və bu vilayətin 55 inzibati vahidə bölündüyünü" yazmışdır. Ən mühüm ticarət mərkəzi olan Təbriz onun mərkəzi şəhəri idi. 9 digər inzibati vahid də ona tabedir [16, 134-143].

Çuxur-Səd bəylərbəyi və ona tabe olan mahal və ulkalardan "Təzkirət əl-müluk"da Naxçıvan tüməni, Maku, Zərzibil, Sədərək, Bəyazid qalası, Şadilu eli ulkası, Dünbuli eli ulkası, Mağazberdin adları göstərilmişdir [21, 165-166; 22, 75-76]. Çuxur-Səd coğrafi istilahı türk Sədli oymağının adı ilə bağlıdır. XV əsrdən Naxçıvan və Sürməli bu oymağın yurdu olmuşdur. Arpa çayının Arazla birləşdiyi yerdən başlayaraq iki çay arasındakı çuxur adı ilə qeyd edilən bu qışlaq oymağın adı ilə Sədli Çuxuru adlanmışdır. V.F.Minorski Münşinin əsərinə istinad edərək yazır ki, Qars Çuxur-Sədlə Ərzurum arasında yerləşir və vilayət digər tərəfdən Axıska ilə həmsərhəddir [21, 165]. V.F.Minorski daha sonra bu tümən və ulkalara aşağıdakı kimi şərh verir: "Naxçıvan Arakses (Araz-E.N.) çayının sol sahilində yerləşir. Naxçıvana əks tərəfə (sağ sahildə?) Abbasabad qalası yerləşir. Maku sağ sahildə, Naxçıvanın şimal-qərbində, Ararat (Ağrı-E.N.) dağdan cənub-şərqdə yerləşir. Zaruzbil kəndi Göyçə gölünün cənub-şərq küncündə mövcuddur. Sədərək Şərur məntəqəsində, İrəvan və Naxçıvan arasındadır. Bəyazid Türkiyədə, Ararat (Ağrı–E.N.) dağının cənubundadır. Şadilu Ararat dağı yaxınlığında kürd tayfasıdır. Dünbuli kürdləri çox güman ki türkləşməyə məruz qalmaqdan xilas olmuş tayfaların bir hissəsidir. Mağazaberd qərbi Arpa çayda qaladır. Ani xarabalığı yaxınlığında, 1639-cu ildə Türk-Pers (Səfəvi-Osmanlı-E.N.) müqaviləsində xatırlanan Persiya (Səfəvi-E.N.) hüdudlarının uzaq şimal-qərbində yerləşir" [21, 166]. V. F.Minorskinin bu şərhinə əlavə olaraq qeyd edək ki, mərkəzi İrəvan şəhəri olan bu bəylərbəyilik İrəvan bəylərbəyiliyi kimi də tanınırdı. Arazın hər iki sahilindəki düzənlikləri əhatə edirdi. XVIII əsrdə Osmanlı nəzarəti altına keçdikdən isə bu bəylərbəyilik müxtəlif nahiyələr, liva, sancaq və şəhərə bölünmüşdü. 1728-ci il tarixli "İrəvan əyalətinin müfəssəl dəftəri"ndən aydın olur ki, əyalət ərazi-inzibati bölgüsü baxımından "İrəvan şəhəri, Qırxbulaq, Karbi, Maku, Xınzirək, Karni (Gərni-E.N.), Vedi, Dərəçiçək, Abaran, Göyçə, Məzrə'ə, Sürməli, İğdır, Aralıq, Şərur, Sədərək, Zirzəmin nahiyələri, Şuragöl (Şörəyel-E.N.) livası və Naxçıvan sancağı"na bölünmüşdü [5, 9].

"Təzkirət əl-müluk"da Qarabağ bəylərbəyinə tabe olan mahal və ulkaların "Zəgəm, Bərdə, Axtabad, Cavanşir eli ulkası, Bərgüşad, Qaraağac, Lori-Pəmbək, Arasbar və Bəyazidli eli ulkası, Suma və Tərgəvərdən ibarət olduğu" göstərilmişdir. Araz və Kür çayları arasında yerləşən qədim Aran torpağı mərkəzi Gəncə şəhəri olan Qarabağ bəylərbəyiliyi hesab olunmaqla onun ərazisi bəzən Tiflisə qədər uzanırdı [22, 76-78]. 1554-cü ildən sonra Qazax və Şəmşəddil, Şah I Abbas dövründə Zəyəm, Səfəvilərin hakimiyyətinin son illərində isə Kaxetiya və Zəngəzur da Qarabağ bəylərbəyiliyinə tabe olmuşdur [2, 105].

V.F.Minorski Zəyəm ulkasının Kaxetiyanın şimalında, hal-hazırda Zaqatala ərazisində yerləşdiyini qeyd edirdi. Bu fikrini əsaslandırmaq üçün İsgəndər bəy Münşinin əsərinə istinad edirdi: "Şah Abbas hicri 1025-ci ildə (1616-cı il) yürüş vaxtı Tiflisə doğru hərəkət edərək Kaxetiyalıların sığınacaq axtardıqları Qanuq (Alazan) çayının şimalına keçdi. Şərqə yaxın olan Şirvan hakimi Şəkinin içərisi ilə yuxarı yolla gedərək Zəgəmi xaraba qoydu. Zəgəm sakinləri isə Dağıstana hücum qorxusu səbəbindən Mazandarana doğru hərəkət etməyə üstünlük verdilər" [21, 166-167]. Bəylərbəyiliyə daxil edilən ərazilərdən Bərdə Tərtər çayı sahilində, Şuşadan şimalda, Gəncədən isə şərqdə yerləşir. Axtabad Pəmbəkin aşağısında, Borçalu dərəsində, Cavanşir Tərtər çayın yuxarı axarında, Qaraağac isə Talış Qaraağacından fərqli olub Kaxetiyanın şərqində, Sığnaqdan cənub şərqə, Alazandan isə cənuba doğru yerləşir. Lori-Pəmbək isə Samxetiya dağının cənubuna doğru Borçalı çayının yuxarısında cənubdan Kür çayı ilə birləşdiyi yerdədir. Arazbar Araz çayının sahili anlamına gəlir, bəyzilu isə tayfa olub, yerləşməsi qeyri-müəyyəndir. Suma Salmasın cənub şərqində, Tərgəvər isə Urmiyadan qərbdə yerləşirdi [21, 166-167]. Gəncə-Qarabağ əyalətinin 1593-cü ilə aid icmal dəftərində isə inzibati bölgü belə təsvir olunur: "12 nahiyəli Gəncə, 4 nahiyəli Bərdə, 7 nahiyəli Xaçın, 5 nahiyəli Axıstabad, 3 nahiyəli Dizaq, 4 nahiyəli Həkəri, 1 nahiyəli Vərəndə sancaqları"[4, 5-6]. Bu bölgü 1727-ci ilə aid Gəncə-Qarabağ əyalətinin dəftərində bir qədər dəyişilmişdi: "11 nahiyəli Gəncə qəzası, 2 nahiyəli Lori qəzası, 9 nahiyəli Xılxına livası, 4 nahiyəli Bərdə livası, 2 nahiyəli Arasbar (Arazbar) livası, 4 nahiyəli Bərgüşad livası, 1 nahiyəli Çuləndər livası, 5 nahiyəli naməlum liva (Xaçın olmalıdır–E.N.)" [4, 9-11].

"Təzkirət əl-müluk"un sonuncu bəhsinin ikinci məqaləsində Şirvan bəylərbəyiliyinə tabe olan mahal və ulkalardan Salyan, Quba, Ərəş və Şəki, Dərbənd, Alpout eli ulkası, Bakı, Cəmişgəzək və Ağdaşın adları qeyd olunmuşdur. Mərkəzi Şamaxı olan Şirvan bəylərbəyiliyi Kürdən Dərbəndə qədər ərazini əhatə edirdi [2, 105]. V.F.Minorski Salyanı Kürün deltasında, Qubbanı (Quba) Samurun cənubunda olduğunu qeyd edirdi. O, Ərəş-Şəkinin qərbdən Şirvana birləşərək Qafqaz dağlarından cənubda yerləşdiyini, Ərəşin Nuxa-Bərdə yolu üzərində olan hazırkı Xanabadın yerində Kürün şimalında olduğunu qeyd edirdi. V.F.Minorski daha sonra yazırdı ki, "Dərbənd 1578-1606-cı illərdə Osmanlı nəzarətinə düşmüş və Şah I Abbas tərəfindən geri qaytarılandan sonra divarları yenidən bərpa olunmuşdur. Alpaut adında Şamaxının cənub-qərbində və Göyçaydan şərqə bir sıra kəndlər vardı. Buna görə də ad tayfanı, yaxud da tayfanı idarə edən hakim nəslin adını ifadə edirdi. Badkubə, külək döyən isə Bakının məşhur adıdır. Cəmişgəzək-Ağdaş. Sonuncu yer Arazın şimalında Ərəşdən Göyçaya qədər uzanırdı. Cəmişgəzək Dərsim (Ərzincanın cənubunda) kürd şiə tayfasının adı olub. Tərkibinə Persiya (Səfəvilər dövləti-E.N.) xidmətinə daxil olmuş 1000 ailə daxil idi. Onlardan bəziləri Xorasan sərhəddində yerləşdirilmişdi" [21, 167-168].

Şirvan bölgəsi də bir müddət Osmanlı idarəçiliyində olmuşdur. Belə ki, Mustafa paşa Şirvanı tutduqdan sonra Şamaxıda Osmanlı sərkərdələrinin şurasını (divanını) çağırdı. Burada, ölkədə sultan hakimiyyətini möhkəmləndirmək üçün tədbirlər müzakirə olundu. Şirvanda türk hərbi-inzibati idarə sistemi tətbiq edildi. O.Əfəndiyev Osmanlı salnaməçisi Əlinin "Künh əl-əxbar" əsərinə istinadən bu barədə yazır ki, "Şirvan mahallardan (sancaqlardan) ibarət olan iki vilayətə-Şamaxı və Dərbənd bəylərbəyiliklərinə bölündü. Şamaxı vilayəti Lahıc, Ağdaş, Qəbələ, Salyan, Zərdab, Şəki, Bakı, Sədəru, Qara Ulus, Axtı və İxır, Diku, Siryan (yaxud Sirhan), Osmani, Xudavərd (yaxud Xudadərd), Mahmudabad, Ərəş, Dərbənd vilayəti isə Dəmirqapı (Dərbənd), Şabran, Axtı (habelə Şamaxının 10-cu sancağı kimi göstərilir), Quba, Müskir (yaxud Məskir), Kürə, Çıraq, Restov sancaqlarından ibarət idi" [3, 150].

Səfəvi dövlətinin Şərq əyaləti Herat, Məşhəd, Qəndəhar və Mərv-Sistan adlı 4 bəylərbəyiliyə bölünmüşdü. Herat əyaləti şimalda Murqab hövzəsinin bütün cənub hissəsini təşkil edirdi: "Bala-Murğab, Mərucağ, Pəncdeh, Badqeys (Küşkün cənubu), cənubda Qor və Fərah ona aid idi; qərbdə o Türbəti-Şeyxi Cəm, Xvaf və hətta Tuna (Mərkəzi Persiya səhrasının kənarında) qədər genişlənirdi. Murğab yolunda Heratdan şimal-şərqə doğru uzanan Kərəc də bura daxil idi. Duv-mi (Durmi?) adlı ərazinin dəqiq yeri bəlli deyil" [21, 168].

Məşhəd-i müqəddəs və ona tabe olanlar: "Sərəxs, Nişapur, Turşiz, Abiverd, Azadvar, Nəsa, Səbzəvər, İsfərayin, Hürüz və Yesaku (?), Durun, Türbəti-Heydəri, Bəzavəndek" [21, 168].

V.F.Minorski Məşhədi Sərəxs, Nişapur, Səbzəvər, İsfərayin, Azadvarla birgə Xorasan şimal hissəsinə aid edir. Məşhədin aşağısında Abivərd (Qahqa dəmir yolu stansiyasından 8 km

qərbə doğru-E.N.), Nəsə (Bagir yaxınlığında, Aşqabadın qərbində-E.N.), Durun (Aşqabad və Qızıl-Arvat arasında-E.N.) yerləşir. Bəzavəndekin isə cənubi Xorasana daxil olması güman olunur.

"Təzkirət əl-mülük"da Zəmindavər və Quryan, Kuşəklə yanaşı Kəri və Lukə, Badqeys, Teymuri, Əli Xacə, Mir Arif Bəluc elləri ulkasının da Qəndəhar bəylərbəyiliyinə tabe olduğu qeyd olunmuş, ancaq sonuncu ellərin Bəluc aşirətləri kimi göstərilməsi aydın deyildir. Ona görə ki, Teymuri və Kəri (Gəraylı-E.N.) təmiz türk aşirətləri olduğunu inkar etmək mümkün deyildir. Göstərilən digər ellərin isə Bəlucla əlaqəsinə dair dövrün başqa qaynaqlarında məlumat verilmir. Maraqlıdır ki, adı ikinci dəfə qeyd edilən Badqeys adlı məntəqənin də izahına gərək var. V.F.Minorski də bunun səbəbini yazmır [21, 169].

Mərv və Sistan bəylərbəyiliyinin "Təzkirət əl-mülük"da ikinci məqalədə adı qeyd olunmuş, ancaq mahal və ulkaları göstərilməmişdir.

Astrabad bəylərbəyiliyi, mahal və ulkalarına gəldikdə isə bu bəylərbəyilik "Xəzər əyalətləri olan Gilan (Dar əl-mərz) və Astrabadı əhatə edir"[21, 169-170] və tərkibinə aşağıdakı ulka və mahallar daxil idi: "Gəraylı eli ulkası, Hacılar eli ulkası, Cəlayir eli ulkası, Qaraçöp və Səhra üzü bölüyü, Göklən və Yomut mahal və ulkaları "Təzkirət əl-mülük"da adı çəkilən bəylərbəyiliyin tərkibində olduqları qeyd edilir. Türk Gəraylı tirəsi Astrabad əyaləti əhalisinin əsas hissəsini təşkil edirdi. Gəraylı obaları Xorasan ərazisində də müxtəlif bölgələrdə məskun idilər. Boz Oxun Ağcalı oymağına bağlı olan Hacıların bir neçə obası isə Kəbud Məscid mahalında yaşayırdılar. Türkmən Qaraçöp obası, Göklən eli, Yomut eli də Astrabad vilayətində məskun olub, Göğlən elinin ulkası Qorqanda, Yomut elinin ulkası isə Astrabadin şimal-şərqində idi" [21, 170].

"Təzkirət əl-mülük"da Dar əl-mərz (sərhəd bölgəsi-E.N.) adı ilə qeyd olunan Gilan Biye-Pas (mərkəzi Rəşt şəhəri idi-E.N.) və Biye-Piş (Lahican-E.N.) adlı iki inzibati bölgədən ibarət idi, hər iki bölgəni də Səfəvilərə tabe olan yerli sülalə idarə edirdi [2, 106]. Şah I Abbas 1592-ci ildə Gilanı xassəyə (yəni hökmdar torpağına-E.N.) çevirir. V.F. Minorski Gilanın Qaskar (Qaşqar?-E.N.), Kohdom, Ranekuh, Tonakabon mahallarından ibarət olmasını göstərmişdir [21, 170].

"Təzkirət əl-mülük"da adı qeyd olunan Kirman isə Cənub-şərqdə olub, sərhəd vilayəti deyildi. Xassə əmlakı tərkibinə daxil olub, sərkare xassey-i şərifə tərəfindən idarə edilirdi [21, 170].

"Təzkirət əl-mülük"da adı çəkilən İraq ayrıca əyalət idi. İsfahan, Həmədan və Tehran arasında yerləşən ərazi isə İraqi-Əcəm adlanırdı [21, 170].

İsfahan xüsusi mahal təşkil edib, məxsusi inzibati idarəçiliyə malik idi. Mərkəzi səhranın qərbində Yəzd, Nayin, Ərdistan, Netenz, Kaşan, Qum və Savə; Farsa tərəf: Abarguh və Qumişa; İsfahanın şimal-qərbində: Dilican və Mahallət; Sultana-bad yolu boyunca: Xansar (Xonsar), Gulpayaqan, Kəmərə (əsas yeri: Xumayn), Fərəhan (Sultanabaddan şimala); İsfahandan qərbə: Çəhar mahala daxil olan Rar, Kiyar, Mizdac, Firaydan; Burburud Gulpayaqandan qərbdə, Əli Gudarz yaxınlığında; Yapalaq Abi Dizin yuxarı axarında yerləşirdi [21, 170].

"Təzkirət əl-mülük"da Qələmrov bəylərbəyiliyinə tabe olan mahal və ulkalar Gərrus, Zərrinkəmər və Tuğanmin (?), Həştadcüft ulkası, Harsin, Kəlhur, Xvar və Simnan, Savə və Havə, Rey ulkasından ibarət olduğu göstərilmişdir [21, 171]. Səfəvi dövlətinin qərb vilayətindən olan Kürdüstanın Xorxora, Cavanrud və Avroman mahallarından ibarət olduğu göstərilir [21, 171-172]. Luristan Feyli (Feyli-Lur tayfalarının adıdır) Kirmanşah və Həmədanın cənubunda olub, Bəxtiyari və Bane mahalları ona tabe idi [21, 172]. Fars-Kuhgiluyə bəylərbəyiliyinə tabe olan ulka və mahallar Bəhreyn, Zeydabad, Dauraq, Sərvistan, Bəndəri Abbas, Dəştistandan ibarət olub, Kuhgiluyə isə əslində Fars, Xuzistan, Bəxtiyari arasındakı ərazidir [21, 172]. 1602-ci ildən Bəhreyn də Kuhgiluyə xanına tabe edilmişdi.

Səfəvilər dövründə Fars vilayətinin əhalisinin müəyyən hissəsini müxtəlif dövrlərdə burada məskunlaşmış türk elləri təşkil edirdilər. Hələ Səlcuqlular dövründə Türkmən Əfşar tayfasından xeyli əhali köçüb Kuhgiluyədə məskunlaşmışdı [2, 108].

"Təzkirət əl-mülük"da Ərəbistan valiliyi və Farsla İsfahan arasındakı Sumayram hakimliyinin yalnız adları qeyd olunmuş mahal və ulkalar barədə məlumat verilməmişdir. Qeyd edək ki, Sumayram Kuh-i Dinanın şimal-şərqində mərkəzi yaylaya qədər uzanırdı [21, 173].

Bütövlükdə nəzərdən keçirdiyimiz bəylərbəyiliklərin hamısı yox, yalnız bir qismi Məmalik-i Məhrusə (Qorunan ölkələr–E.N.) hesab olunurdu ki, bu ərazilər Azərbaycan, Fars, İraq və Xorasan idi [12, 296]. "Təzkirət əl-mülük"da Dövlətxanə xaricindəki əmirlər (Ümərayi Qeyri Dövləthanə)-Valilər, Bəylərbəyilər, Xanlar və Sultanlardan ibarət olan bu qrup "Sərhəd əmirləri"

olaraq adlandırılırdı [12, 298]. "Təzkirət əl-müluk"a görə, Səfəvilərdə 4 vali vardı. Bu 4 valinin idarəsindəki ərazilərin Məmaliki Məhrusədə sayılanlardan fərqli olması, onların eyni zamanda "Allahın Qoruduğu Vilayətlər" əhatəsində olmadığını ifadə edir. Bu isə Məmaliki Məhrusə əhatəsindəki ərazilərin daşıdıqları mənanın əhəmiyyətini də göstərməkdədir [12, 299]. "Təzkirət əl-müluk"da bu valilərdən bu cür bəhs edilir: "Ərəbistan valisi, seyidlə, qəhrəmanlıq, el və tayfanın sayca çox olması baxımından digər valilərə görə ən böyük və ən şanlısıdır. Ondan sonra Luristan Fayli valisi gəlir. O, İslama əziz olma baxımından Gürcüstan valisindən daha çox şanlıdır. Gürcüstan vilayətlərindən Kartli, Kaxeti və Tiflis səfəvi tabeliyindədir. Gürcüstan valisindən sonra Kürdüstan valisi gəlir, mərkəzi Sənəndəçdir." V.F.Minorski valilərin mərkəzi iqtidardan maliyyə baxımından ayrı olduğunu yazır. Ərəbistan, Luristan, Gürcüstan və Kürdüstandan ibarət valilərin hüdudlarının göstərilməməsini o bölgələrin valilərinin mərkəzi iqtidardan maliyyə baxımdan ayrı olması ilə əlaqələndirirdi [12, 300].

Qızılbaş dövlətinin inzibati və ərazi bölgüsü nəzərdən keçirdiyimiz kimi hər zaman bu cür sabit formada qalmamışdır. Belə ki, dövlətin yarandığı vaxtdan müəyyən fasilələrlə qərbdə Osmanlılarla, şərqdə isə Özbəklərlə aparılan müharibələr tez-tez bəzi ərazilərin əl dəyişdirməsi ilə nəticələnmişdir. Adel Alluoşa görə, dini uyğunsuzluq olmasına baxmayaraq, Səfəvilər ilə Özbəklər arasındakı mübahisə böyük ölçüdə Xorasanı kimin idarə edəcəyi barəsindəki rəqabətdən yaranırdı [15, 103]. Lakin Osmanlılarla toqquşma isə torpaq məsələsindən daha çox Səfəvilərin öz sərhədləri xaricində və xüsusilə də Anadoludakı geniş Qızılbaş təqibçilərini idarə etmə üstünlüyü, Osmanlı imperatorluğunun təməli üçün təhlükə olmuşdur [12, 102]. Orta və Şərqi Anadolu hər iki hökmdarın nüfuz dairəsi idi. Məhz bu səbəblər Osmanlı ilə Səfəvini Çaldıranda qarşı-qarşıya gətirdi [12, 105]. Çaldıran döyüşündən əvvəl Osmanlı Səfəvi sərhədlərini Faruk Sümer bu cür qeyd edirdi: "Çaldıran döyüşündən əvvəl Osmanlı-Səfəvi hüdudu Sivasa bağlı Suşəhrindən keçirdi, ondan sonra Fəratı təqib etməklə Məmlük Səfəvi sərhəddi başlayırdı. Divriği, Darəndə, Malatya, Ayıntab Məmlüklərin, Kemah möhkəmləndirilmiş qalası ilə Xarput və Urfa da Səfəvilərin hüdud şəhərlərini təşkil edirdi. Yavuz Sultan Səlim sonrası isə Osmanlı sərhəddi belə idi. Yavuz Səlim Məmlükləri tək bir yürüşlə ortadan qaldıraraq, Anadolunun Çukur ova, Divriği, Malatya, Antep və Antakya kimi bəzi bölgələri ilə Suriya, Misir və Hicazı ölkəsinə qatmışdı. İmperatorluğun hüdudları Cənub-şərqdə İraqa söykənirdi"[11, 38]. Nəticədə "şimalda Xarputdan və Bitlisdən, cənubda isə Rəkkə və Mosula qədər olan torpaqlar Osmanlıların əlinə keçir. 1514-1515-ci ilin qışını Asiyada keçirən Sultan I Səlim (1512-1520) İstanbula doğru hərəkət edir. Kemahı alır. Ərzincanı tutur [12, 110].

1555-ci ilin mayında isə Amasyada sülh imzalandı. Bu müqaviləyə görə Şəhrizor əyaləti, Van gölü ətrafı Osmanlılarda qalır və şimalda Arpaçay hüdudu təşkil edirdi. Bu müqaviləyə görə Şəhrizor əyaləti, Van gölü ətrafı Osmanlılarda qalır və şimalda Arpaçay hüdudu yaradırdı. Oqtay Əfəndiyevə görə Qərbi Gürcüstan vilayətləri (İmeretiya, Meqreliya və Quriya) Osmanlı hüdudlarına qatılır. Şərqi Gürcüstan vilayətləri (Mesxiya, Kartli və Kaxetiya) Səfəvi dövlətinin sərhədləri içərisində qalır. Hazırki Ermənistanın qərbi Osmanlı hakimiyyəti altına keçir, şərqi isə Səfəvilərin hakimiyyəti altında qalır. O, İsmayıl Haqqı Uzunçarşılının guya "bu barışa əsasən Azərbaycan (Təbriz də daxil olmaqla) Osmanlıların hakimiyyəti altına keçmişdir" iddialarının heç bir mənbəyə dayanmadığını, uydurma olduğunu da yazırdı [3, 92].

Amasya sülhü Şah I Təhmasib (1524-1576) üçün böyük bir uğur idi. Şah I Təhmasib bu müqavilə ilə İslam dünyasının ən qüdrətli dövlətinə Səfəvi dövlətinin varlığını ikinci dəfə üçün qəbul etdirmiş oldu. Çünki bu müqaviləyə qədər "1504-ci ildə Sultan II Bəyazid Mehmed Çavuş Balabanın başçılığı altında elçi heyətini bəxşiş və ərməğanlarla həmin zaman İsfəhanda yeni tikilmiş Nəqş-i Cahan sarayında Şah İsmayılın yanına göndərməklə" [6, 231-232] Səfəviləri bir dövlət olaraq tanımış, məktublarında isə Şah I İsmayılı "Böyük padişah, Əcəm məmləkətlərinin əzəmətli hökmdarı, Türk və Deyləm diyarının əmiri" [7, 45] adlandırmışdır. Amasya müqaviləsi isə sadəcə Sultan II Bəyazidən (1481-1512) sonra Osmanlı sultanlarının bu dövləti aradan qaldırmaq istəyinə son vermişdir. Şah I Təhmasib bu uğuru əldə etməklə Səfəvi hakimiyyətini qüvvətləndirmiş, məhəlli xanədanları aradan qaldıraraq Şirvan, Gilan və Qəndəharı birbaşa olaraq ölkəsinə birləşdirmişdi [11, 68].

Şah I Təhmasib dövründə də Şeybanilər Xorasanı ələ keçirmək üçün səy göstərdilər, amma, yalnız şimal-şərq qismində (yəni Bəlx vilayətində) uğur qazandılar. O zamankı Xorasanın digər üç vilayəti-Herat, Məşhəd və Mərv yenə də Səfəvi hakimiyyəti altında qaldı. Durmuş xanın

ölümü ilə 1526-cı ildə təkrar özbəklər Amudəryanı ələ keçirərək Tus kəndini tutdular, daha sonra 1527-ci ildə Astrabadı alırlar. Qərbdə olduğu kimi şərqdəki döyüşlərdə də Səfəvilərin mübarizəsi müdafiə xarakterli idi. Özbəklərin yürüşləri 1569-70-ci illərə qədər davam etdi [3, 100].

1578-ci ildə yenidən pozulan Osmanlı-Səfəvi sülh müqaviləsi 1587-ci ilə qədər davam edən müharibə sonunda 1590-cı il İstanbul sülhü ilə yekunlaşmışdı. Bu sülhə görə, Tiflis, Çuxur-Səd, Qarabağ (mərkəzi Gəncə), Şirvan (mərkəzi Şamaxı), Azərbaycan (mərkəzi Təbriz), Nihavənd əyalətləri Osmanlı idarəsinə keçmiş, qızıl taclı xanların və sultanların yerini ağ müzəvvəcəli paşalar və bəylər almışdı [11, 152]. Özbəklər də fürsətdən istifadə edərək 1587-ci ildə Herat və Məşhəd şəhərlərini zəbt etdilər. Özbək fəthləri də getdikcə genişlənməkdə idi [11, 147]. Lakin, Şah I Abbas idarəçiliyi ələ aldıqdan sonra yalnız dövlətin əsas dayağı olan Qızılbaşları nəzarət altına almaqla kifayətlənmədi. Gilan, Mazandaran, Sistan, Lar və Luristandakı məhəlli əmirliklərə də son verərək Səfəvi hakimiyyətini həmin ərazilərdə tam şəkildə bərqərar etdi. 1598-1599-cu illərdə Özbəklərdən Xorasanı asanlıqla geri aldı. Səfəvi hüdudunu Ceyhuna qədər uzatdı. Şah I Abbas kürd hakimlərindən Qazinin kömək tələbindən istifadə edərək 1603-cü ildə Osmanlılara qarşı başladığı hərbi uğurla davam etdirib itirilən bütün əraziləri geri almaqdan savayı Bağdad əyalətini də yenidən fəth etmiş oldu [11, 153]. 20 noyabr 1612-ci il II İstanbul, digər adı ilə Nasuh Paşa sülhü ilə imzalandı [12, 144]. Bununla da 1555-ci ildəki Amasya sülhündəki sərhədlər yenidən bərqərar olur. 1615-ci ildə tərəflər arasındakı münasibətlər pozulsa da 26 sentyabr 1618-ci il Sərab sülhü ilə yenidən Amasya sülhünün şərtləri bərqərar edildi [9, 118-120].

Şah I Abbasın ölümündən sonra onun varisi Şah I Səfi (1629-1642) taxta çıxır. Zəif bir şəxsiyyət olması Səfəvilər dövlətində yenidən daxili qarışıqlığın ortaya çıxmasına səbəb olur. Bu vəziyyətdən həm özbəklər, həm də Osmanlı sultanı IV Murat (1623-1640) yararlanır. Şah I Abbasın ölümü ilə Sultan IV Murad şərqə yürüş qərara alır. 1635-ci ilin baharında böyük bir ordu ilə Şərqə yürüşə başlayır. 1635-ci ildə İrəvanı və Təbrizi alır. 1638-ci ildə Bağdadı alır. 1639-cu il müqaviləsi ilə Azərbaycan, o cümlədən də İrəvan Səfəvilərdə qalır, İraqi-Ərəb Bağdadla birlikdə Osmanlıların nəzarətinə keçir [9, 275-276].

Osmanlılarla Səfəvilər arasında 17 may 1639-cu ildə Qəsri-Şirində növbəti dəfə sülh elan edilir. İmzalanan müqaviləyə görə Bağdad tərəfindən hüdud, Bədrə, Cəssan, Hanikin, Mendeli, Dərnə, Dərtənək, Sərmənəl mövqeyinə qədər olan və burada Caf aşirətinin bəzi qəbilələri və Zəncir qalasının qərbindəki kəndlər və Şəhrizor yaxınındakı Zalım Əli qalası ətrafı Osmanlılara qalır. Bunun xaricində şimal hüdudundakı Qars, Axıska ilə Van, Şəhrizor, Bağdad və Bəsrə hüdudlarına Şah tərəfindən əsla basqın edilməyəcəyi sülh şərtləri arasında var idi. Bundan savayı Zəncir qalası, Van hüdudundakı Qotur, Maku, Qars tərəflərində olan qalalar hər iki tərəfdə söküləcəkdi. Beləliklə bu müqavilə ilə Bağdad, Bəsrə, Şəhrizor ətrafı olan "İraqi-Ərəb" Osmanlılara qalır [9, 275-276]. Qəsri-Şirin sülhündən sonra bir-birindən asanlıqla qoparıb ala biləcəkləri bir şey olmadığını başa düşdükdən sonra Osmanlı Səfəvi dövlətlərinin sərhədlərində uzun müddət səssizlik olmuşdur. Bu müqavilə ilə hər iki tərəf öz hüdudlarına çəkilmişdir. Bu sülh sonrasında bir sıra obyektiv və subyektiv səciyyəli səbəblər üzündən-Şah Süleymanın (1666-1694) uğursuz vəliəhd seçimi, Şah Sultan Hüseynin dövlət işlərinə biganəliyi, bacarıqsızlığı, qətiyyətsizliyi, hərəmxana mühitinin varislərə güclü təsiri, irticaçı feodal əyanları və şiə ruhanilərinin güclənməsi, ordunun uzun müddət fəaliyyətsiz qalma səbəbindən döyüş ruhunun zəifləməsi və mənəvi düşkünlük, mərkəzdənqaçma meylləri və şah hökumətinin bunun qarşısını ala bilməməsi, qeyri-adekvat və qeyri-effektiv tədbirləri, əfqan, daha sonra rus, türk işğalları və bunların nəticələri, Nadirin xanın hakimiyyəti ələ keçirmək uğrunda mübarizəsinin güclənməsi ilə XVIII əsrin birinci qərinəsində Səfəvilər dövləti tənəzzül edərək siyasi səhnəni tamamilə tərk etdi.

Yekunda Səfəvilər dövlətinin inzibati-ərazi bölgüsü tədqiqi zamanı hasil olan nəticələri aşağıdakı kimi sistemləşdirə bilərik:

1. Səfəvilər dövləti üçün müxtəlif mənbələrdə verilən inzibati-ərazi bölgüləri cüzi fərqlərlə bir-birini təkrarlayır. Bu mənbələr arasında yalnız "Təzkirət əl-müluk" adlı mənbə daha etibarlı və ümumiləşdirici hesab oluna bilər.
2. "Təzkirət əl-müluk" adlı mənbədən də məlum olduğu kimi bir çoxlarının İran, yaxud Persiya ifadələri ilə təqdim etdiyi Səfəvilər dövləti əslində Məmalik-i Məhrusə, yəni Qoru-nan Ölkələr adlanırdı. Bu ölkələrə aid edilən əyalətlər isə Azərbaycan, Fars, İraq və Xo-rasan idi. Bu əyalətlərdən fərqli olaraq Ərəbistan, Luristan, Gürcüstan və Kürdüstan vila-yətlərin "Allahın Qoruduğu Vilayətlər" əhatəsində olmaması, hüdudlarının göstərilmə-məsi o

bölgələrin Osmanlı və Şeybanilərlə müharibələrin nəticəsindən asılı olaraq nəza-rətdən çıxdığını göstərirdi.

3. Tez-tez sərhəd dəyişmələri ilə nəticələnən müharibələrə əslində dini anlaşılmazlıq yox, ərazi mübahisəsi səbəb olmuşdur. Səfəvilər ilə Özbəklər arasındakı mübahisə də daha çox Xorasanı kimin idarə edəcəyi barəsindəki rəqabətdən yaranırdısa, Osmanlılarla toq-quşma ən çox Orta və Şərqi Anadolu üzərində nəzarət uğrunda baş vermişdir.

**Ədəbiyyat:**


1. Azərbaycan tarixi. Yeddi clddə. II cild (III-XIII əsrin I rübü). Bakı: Elm, 2007, 608 s.
2. Bayramlı Z.H. Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə sistemi. Monoqrafiya. Bakı: ADPU, 2006, 258 s.
3. Əfəndiyev O.Ə. Azərbaycan Səfəvilər dövləti. Bakı: Şərq-Qərb, 2007, 344 s.
4. Gəncə-Qarabağ əyalətinin müfəssəl dəftəri. Ön söz, tərcümə, qeyd və şərhlərin müəllifi Hüsaməddin Məmmədov (Qaramanlı). Bakı: Şuşa nəşriyyatı, 2000, 576 s.
5. İrəvan əyalətinin icmal dəftəri./ Araşdırma, tərcümə, qeyd və əlavələrin müəllifləri: Ziya Bünyadov və Hüsaməddin Məmmədov (Qaramanlı). Bakı: Elm, 1996, 184 s.
6. Musalı N. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl"əsəri əsasında). Bakı: Elm və təhsil, 2011, 482 s.
7. Şah İsmayıl Səfəvi: Tarixi-diplomatik sənədlər toplusu. Bakı: Şərq-Qərb, 2014, 400 s.
8. Gündüz T. Seyyahların gözüyle sultanlar ve savaşlar. İstanbul:Yeditepe, 2012, 246 s.
9. Küpeli Ö. Osmanlı-Safevi münasebetleri (1612-1639). İstanbul: Yeditepe, 2014, 336 s.
10. Osman G.Özgüdenli. Osmanlı İranı: Batı İran ve Azerbaycan tarihi hakkında Osmanlı tahrir kayıtları: Coğrafi ve İdari taksimatı./Ankara Üniversitesi Dil ve Tarih-Coğrafya Fakültesi Tarih Araştırmaları Dergisi 22/34, 2003, s. 83-107
11. Sümer F. Safevi devletinin kuruluşu ve gelişmesinde Anadolu türklerinin rolü. Ankara: Güven Matbaası, 1976, 265 s.
12. Veliyeva Z.E. Safevi devlet teşkilatı (Tezkiretü'l-Müluk'e Göre). Doktora Tezi. T.C. Ankara Üniversitesi. Bosyal Bilimler Enstitüsü tarih (Genel türk tarihi).Anabölüm dalı. Ankara. 2007, 431 s.
13. Массон В.М., Ромодин В.А. История Афганистана в двух томах. Том II. Афганистан в новое время. М.: Наука, 1965, 552 с.
14. Петрушевский И.П. Очерки по истории феодальных отношений в Азербайджане и Арме-нии в XVI – начале XIX вв. Ленинград: издательство Ленинградского ордена Ленина университета имени А.А.Жданова. 1949, 384 с.
15. Allouche, Adel. The Origins and Development of the Ottoman-Şafavid Conflict (906-962 /1500-1555). Berlin: Klaus Schwarz Verlag, 1983, 203 p.
16. Engelberto Kaempfero, D. Amœnitatum exoticarum politico-physico-medicarum fasciculi V: quibus continentur variæ relationes, observationes & descriptiones Rerum Persicarum & Ulterioris Asiae, multá attentione, in peregrinationibus per universum Orientem, collectæ, Limgoviae: Typis & Impensis Henrici Wilhelmi Meyeri, Aulae Lippiacae Typographi, 1712, 990 p.
17. Sarwar, History of Shah Isma'il Safawī, India: The Muslim University, Aligarh 1939, 127 p.
18. Hamd-Allah Mustawfi of Qazwin. The Geographical Part of the Nuzhat-al-Qulub. Translated by G. Le Strange, Leyden: E.J.Brill, Imprimerie Orientale, London: Luzac & Co., 46, Great Russell. Street, W.C, 1919, 322 p.
19. Krusinski J.T. The chronicles of a traveller: or, a history of the Afghans wars with Persia, in the beginning of the last century, from their commencement to the accession of Sultan Ashruf. Being a translation of the "Tareekh-i-Seeah," from the latin of J.C. Clodius, prof. arab. at Leipzig, by George Newnham Mitford, ESQ. London: James Ridghway, Piccadilly, 1840, 268 p.
20. Voyage ou relation de l'etat present du royaume de Perse. Avecune differtation curieufe fur les Moeurs, Religion & Gouvernment de cet Etat. Par. Mr *** Sanson. Enrichi de Figures. A Paris : Chez la veuve Mabre Cramoisi. M.DC.XCV [1695], 292 p.
21. Tadhkirat al-muluk. A manual of Safavid Administration (circa 1137/1725). Persian text in Fac-simile (B.M. Or. 94-96). Translated and explained by V.Minosky. London: printed by W. Heffer & Sons, 1943, 360 p.

22. Təzkirət əl-müluk. Be kuşeşe Məhəmməd Dəbirisiyaqi. Tehran: Xeyabane Şah-Abad, h.1332 (1956), 120+22 s.

**Эльнур Наджиев**

**Административно-территориальное деление государства Сефевидов**

**Резюме**

В статье проанализированы различные источники, в которых имеются сведения об административно-территориальном делении государства Сефевидов. В ходе исследования мы отдали предпочтение сведениям, имеющимся в сочинении «Тазкират-ал-мулук». Государство Сефевидов делилось на 4 вилайета и 13 беглярбегства. В статье в отдель-ности рассматривается все административно-территориальные единицы Сефевидской державы.

**Elnur Najiyev**

**Administrative-territorial division of the safavid state**

**Summary**

In the article analysed various sources having information about administrative-territorial division of the Safavid state. During the research we preferred the information getting from "Tadhkirat al-muluk". The Safavid dynasty was divided into 4 provinces and 13 beglarbegies. In the article separately considered all administrative-territorial units of the Safavid state.

# MÜNDƏRİCAT

## QORQUDŞÜNASLIQ 4-402



Format 60 x 84 1/6
Sifariş №01. Sayı 200
"Araz" nəşriyyatında çap olunmuşdur.